UOT58:615

# TOVUZ-QAZAX RAYONLARINDA BƏZİ YABANI YEYİLƏN BİTKİLƏRİN TƏDARÜKÜ VƏ ƏMTƏƏ SƏCİYYƏSİ

**V.N.ABBASOVA**
**Azərbaycan Dövlət Aqrar Universiteti**

*Məqalədə Kiçik Qafqazın şimali-şərqində yerləşən Tovuz və Qazax rayonları ərazisində yayılan və yerli icmalar tərəfindən kütləvi tədavü edilən bitkilərin əmtəə səciyyəsi barədə məlumat verilir. Belə ki, tədqiqat ərazisində bazarlarda əmtəəli yabanı yeyilən bitkilərin 14 fəsilə, 21 cinsinə aid 24 növü satılır. Cinslər üzrə: Rumex L.-3, Urtica L.-2, qalan 19 cinsin isə hər biri bir növlə təmsil olunur. İlk olaraq bazara cinsilim, qazayağı çıxarılır. Daha sonra isə körpə cacıq (ağca), çiriş, yemlik, yarpız, güllücə (quşquyruğu), quşüzümü (mərəçöyürd), gicitkən və s. satılır. Bu məhsullar təzə halda satılır. Yabanı yeyilən bitki məhsullarının bir kiloqramının ilkin satış qiyməti 3-2,5 manat təşkil edir. Məhsullar bollaşdıqca və çeşid artdıqca satış qiyməti 1-0,2 manat arasında dəyişir. Yabanı yeyilən bitkiləri məhsullarının tədarük və istehlakı kortəbii xarekter daşısa da tələbatın ödənilməsinə müsbət təsir göstərir.*

*Yabanı yeyilən bitkilər bazarlarda müxtəlif əmtəə formalarında (təzə, duza qoyulmuş və qurudulmuş halda) satılır. Bu bitkilərin məhsuları təzə halda mart-may aylarında, duza qoyulmuş və qurudulmuş halda isə demək olar ki, bütün il boyu tədavüyə buraxılır. Duza qoyulmuş və qurudulmuş halda yabanı tərəvəz məhsulları uzun müddət əlavə xərc çəkmədən saxlandığı üçün onlar ticarət dövriyyəsində əsaslı mövqe tuturlar. Əmtəə məqsədli yabanı yeyilən bitkilərin 18 növü təzə, 4 növü duza qoyulumüş və 8 növü isə qurudulmuş halda satılır. Bu bitkilərin əmtəə səciyəsi, məhvolma təhlükəsinin qarşısının alınması və ticarət dövriyyəsində davamlılığını möhkəmləndirilmsi məqsədilə konkret təkliflər hazırlanmışdır.*

***Açar sözlər**: Yabanı yeyilən bitkilər, tədavü edilən növlər, əmtəə səciyyəsi.*

Ərzaq təhlükəsizliyi dünyanın qlobal problemlərindən biridir. İnsanların saf və təmiz qidaya ehtiyacı getdikcə daha çox artır. Belə ki, bazar iqtisadiyyatı, qeyri-sağlam məhsul istehlakı rəqabəti bu tələbatı daha da aktuallaşdırır. Cəmiyyət yabanı floranın qida bitkilərindən daha çox istifadə etməyə başlayıbdır. Artıq bazarlarda yabanı tərəvəz bitkiləri təzə, duza qoyulmuş və qurudulmuş halda satılır. Yabanı tərəvəz bitkiləri iqtisadiyyatımızda öz mövqelərini getdikcə möhkəmləndirirlər. Bu bitkilərin yeni – əmtəə xüsusiyyətləri ortaya çıxır.

Azərbaycan florasında yabanı yeyilən bitkilərinin özünəməxsus yeri vardır. Onların etnobioloji əsaslarla araşdırılması və xalqa çatdırılması ən aktual problemlərdən biridir. Bunu nəzərə alaraq Tovuz-Qazax ərazisinin yabanı qida (müxtəlif formalarda – bişirilmiş, çiy, duza qoyulmuş, qurudulmuş və s. yeyilən) bitkilərinin araşdırılmasını qrşıya məqsəd qoyduq.

**Material və metodika.** Tədqiqat işi 2016-2018-ci illərdə Tovuz –Qazax rayonlarında aparılmışdır. Aparılan tədqiqat zamanı etnobotaniki metodlardan [3-6] və vizual görüntülərdən istifadə edilmişdir. Növlərin adının dəqiqləşdirilməsində Azərbaycan florası çoxcildliyindən [1] və son nomenklaturalardan istifadə edilmişdir [2]. Tədqiqat illərində erkən yazdan başlayaraq bölgənin müxtəlif bazarlarında da tərəfimizdən müşahidələr aparılmış, satışa çıxarılan əmtəə səciyyəli yabanı bitkilər barədə məlumatlar toplanılmışdır.

**Nəticələr və müzakirə.** Tədqiqatın əsas məqsədi ərazidə yabanı yeyilən bitkilərin tədarükü və əmtəə səciyyəsinin öyrənilməsi olmuşdur. Ərazidə yayılmış yabanı yeyilən bitkilər əmtəə məqsədilə istifadə olunur. Tədqiqat apardığım Tovuz-Qazax rayonlarında qış kəskin soyuq və uzunmüddətli keçir. Eyni zamanda örtülü sahələrdə və istixanalarda tərəvəz yetişdirmək baha başa gəldiyindən, tərəvəz məhsullarına (göyərti) tələbat artır. Daxili tələbat digər yerlərdən gətirilmiş aşağı keyfiyyətli məhsullar hesabına qismən ödənilir. Yerli məhsul aprel, may aylarında bazara çıxarılır. Mədəni şəkildə becərilən tərəvəz mənsulları daxili tələbatı ödəmədiyindlən mart ayından başlayaraq bazarlarda yabanı tərəvəz bitkiləri satılmağa başlayır.

İlk olaraq bazara cinsilim, qazayağı çıxarılır. Daha sonra isə körpə cacıq (ağca), çiriş, yemlik, yarpız, güllücə (quşquyruğu), quşüzümü (mərəçöyürd), gicitkən və s. məhsullar təzə halda satılır. Yabanı yeyilən bitki məhsullarının bir kiloqramının ilkin satış qiyməti 3-2,5 AZN təşkil edir. Məhsullar bollaşdıqca və çeşid artdıqca satış qiyməti 1-0,5 manat arasında dəyişir. Yabanı yeyilən bitkiləri məhsullarının tədarük və istehlakı kortəbii xarekter daşısa da tələbatın ödənilməsinə müsbət təsir göstərir.

Aparılan sorğu və müşahidələr nəticəsində Tovuz-Qazax bölgəsində əmtəə xarekterli yabanı yeyilən bitkilərin növ tərkibi müəyyənləşdirilmişdir (Cədvəl 1).

Cədvəl 1

**Əmtəə xarekterli yabanı tərəvəz bitkilərinin növ tərkibi**

| Fəsilələr üzrə | N ö v l ə r | |
|---|---|---|
| | Latınca adı | Yerli adı |
| *Alliaceae* J. Agardh | *Allium rotundum* L. | Yumru soğan |
| *Apiaceae* Lindl. | *Chaerophyllum aureum* L. | Qızılı cacıq |
| | *Falcaria vulgaris* Bernh | Adi qazayağı |
| | *Heracleum trachyloma* Fisch. et C.A.Mey. | Sərtkənaryarpaq b. |
| *Asparagaceae* Juss. | *Asparagus officinalis* L. | Dərman quşüzümü |
| *Asphodelaceae* Juss. | *Eremurus spectabilis* Bieb. | Görkəmli çiriş |
| *Asteraceae* Martinov | *Tragopogon reticulatus* Boiss. &Huet. | Zehli yemlik |
| | *Achillea tenuifjlia* Lam. | Nazikyarpaq boymadərən |
| *Araceae* Juss. | *Arum rupicola* Boiss. | Qayalıq danaayağı |
| *Brassicaceae* Burnett | *Capsella bursa – pastoris* (L.) Medik | Çoban çantası, quşəppəyi |
| *Capparaceae* Juss. | *Capparis herbaceae* Willd | Otvari kəvər, yalama, çöl qarpızı |
| *Caryphyllaceae* Juss. | *Stellaria media* (L.) Vill. | Orta cincilim |
| *Hyacinthaceae* Batsch ex Borkh. | *Ornithogalum ponticum* Zahar | Ponti quşsüdü laləsi |
| | *Puschkinia scilloides* Adams | Zümrüdvari puşkiniya |
| *Polygonaceae* Juss. | *Polygonum mospeliense* Thieb.ex Spach | Yolotu |
| | *Rumex acetosa* L. | Adi əvəlik |
| | *R. euxinus* Klok | Yumrukök ə. |
| | *R. acetosella* L. | Turşəngvari ə |
| *Lamiaceae* Martinov | *Ziziphora tenuior* L. | Nazik dağ nanəsi |
| | *Satureja macrantha* C. A Mey. | Iri çiçək çöl nanəsi |
| | *Mentha longifolia* (L.) Huds. | Uzunyarpaq yarpız |
| *Fabaceae* Lindl. | *Lathyrus miniatus* Bleb ex Stev | Kiçik güllücə |
| *Urticaceae* Juss. | *Urtica dioica* L. | Ikievli gicitkən |
| | *U.urens* L. | Dalar g. |

Cədvədən göründiyi kmi bazarlarda əmtəə kimi yabanı yeyilən bitkilərin 14 fəsilə, 21 cinsinə aid 24 növü satılır. Cinslər üzrə: *Rumex* L.-3, *Urtica* L.-2, qalan 19 cinsin isə hər biri bir növlə təmsil olunur. Lakin bu bitkilərdən bəziləri nadir bitkilərdir və yabanı floradan yox olmaq təhlükəsindədirlər (şək.1, 2).





Şək.1. *Eremurus spectabilis* Bieb. Şək.2. *Puschkinia scilloides* Adams

Yabanı yeyilən bitkilər bazarlarda müxtəlif əmtəə formalarında (təzə, duza qoyulmuş və qurudulmuş halda) satılır. Bu bitkilərin məhsuları təzə halda mart-may aylarında, duza qoyulmuş və qurudulmuş halda isə demək olar ki, bütün il boyu tədavüyə buraxılır. Duza qoyulmuş və qurudulmuş halda yabanı tərəvəz məhsulları uzun müddət əlavə xərc çəkmədən saxlandığı üçün onlar ticarət dövriyyəsində əsaslı mövqe tuturlar. Bu bitkilərin təsnifatı hazırlanmış və 2 saylı cədvəldə göstərilmişdir.

**Cədvəl 2.**

**Yabanı tərəvəz bitkilərinin əmtəə formaları (növlər üzrə)**

| № | Əmtəə məqsədli növlər | Əmtəə formaları | | |
|---|---|---|---|---|
| | | Təzə | Duza qoyulmuş | Qurud ulmuş |
| 1. | *Portulaca oleracea* L. | | + | |
| 2. | *Stellaria media* (L.) Vill. | + | | |
| 3. | *Rumex acetosa* L. | + | | + |
| 4. | *R.euxinus* Klok | + | | + |
| 5. | *R. acetosella* L. | + | | |
| 6. | *Capparis herbaceae* Willd | + | + | |
| 7. | *Capsella bursa – pastoris* (L.) Medik | + | | |
| 8. | *Urtica dioica* L. | + | | |
| 9. | *U.urens* L. | + | | |
| 10. | *Lathyrus miniatus* Bleb ex Stev | + | | |
| 11. | *Chaerophyllum aureum* L. | + | | |
| 12. | *Falcaria vulgaris* Bernh | + | | + |
| 13. | *Heracleum trachyloma* Fisch. et C.A.Mey | | + | |
| 14. | *Tragopogon reticulatus* Boiss. &Huet. | + | | |
| 15. | *Achillea tenuifjlia* Lam. | + | | |
| 16. | *Ziziphora tenuior* L. | | | + |
| 17. | *Satureja macrantha* C. A Mey. | | | + |
| 18. | *Mentha longifolia* (L.) Huds. | + | | + |
| 19. | *Eremurus spectabilis* Bieb. | + | | |
| 20. | *Ornithogalum ponticum* Zahar | + | | |
| 21. | *Puschkinia scilloides* Adams | | | + |
| 22. | *Allium rotundum* L. | + | + | |
| 23. | *Asparagus officinalis* L. | + | | |
| 24. | *Arum rupicola* Boiss. | | | + |
| | Cəmi | 19 | 4 | 8 |

Eyni məhsul iki əmtəə formasında satıla bildiyindən onların çeşidi artır. Bu isə bir məhsulu müxtəlif əmtəə formalarında realizə etməklə daha çox xalis gəlir əldə etməyə imkan verir. Cədvəl 2-dən göründüyü kimi əmtəə məqsədli yabanı yeyilən bitkilərin 19 növü təzə, 4 növü duza qoyulumüş və 8 növü isə qurudulmuş halda satılır.

Bu bitki növlərindən yalnız 16-sı təzə, 2-i həm tərəvəz kimi fəraş, həm duza qoyulmuş və 4-ü həm təzə, həm də qurudulmuş halda bazarlarda satılır.

Qızılı cacıq, adi qazayağı, görkəmli çiriş təzə halda, sərtkənar baldırqan, otvari kəvər (çöl qarpızı, qarnıyarıq), yumru soğan (kəvər soğan) duza

qoyulmuş, adi əvəlik, yumrukök əvəlik (dikcə), uzunyarpaq yarpız, zümrüdvari puşkiniya (ələyəz), qayalıq danaayağı (kecab) qurudulmuş halda kütləvi surətdə bazarlarda satılır.

Bu bitkilər heç bir ekoloji tarazlıq gözlənilmədən əhali tərəfindən toplanılaraq tədarükə buraxılır. Onların əmtəə səciyəsi, məhvolma təhlükəsinin qarşısının alınması və ticarət dövriyyəsində davamlılığını möhkəmləndirilmsi ilə əlaqədar tərəfimizdən konkret təkliflər hazırlanmışdır:

➢ Əmtəə məqsədli yabanı tərəvəz bitkilərinin tədarükünü həyata keçirmək üçün ehtiyatı bol olan ərazilərdən toplanılması, istelakı uçun isə şəhərlərdə kiçik market və milli mətbəxlərin yaradılması məqsədəuyğundur.

➢ Daxili və xarici tələbatı ödəmək və ticarət dövriyyəsini möhkəmləndirmək üçün bu bitki növlərinin mədəni florada introduksiyası və çoxaldılmasının həyata keçirməsi məqsədəuyğun olardı.

➢ Nadir və məhvolma təhlükəsi qarşısında olan növlərin (məs. *Puschkinia scilloides, Eremurus spectabilis* və s.) tədarükünə qadağa qoyulması tövsiyyə edilir.

**ƏDƏBIYYAT**

1. Флора Азербайджана. АН Азерб.ССР. Т. I - VIII Баку, 1950 -1961. 2.Черепанов С.К. Сосудистые растения России и сопредельных государств (в пределах бывшего СССР). СПб. : Мир и семья – 95, 1995, 990 с. 3.Balick, Michael J. and Cox, Paul Alan. Plants, People, and Culture. The Science of Ethnobotany Scientific American Library, 1996. 4.Butura Valer. Etnobotanica (o schiţare a problemelor ce se pun în acest domeniu) // Sociologie Românească. An V. 1943. (упоминалось у Ольги Лукьянец. Журнал Sociologie Rom â neasc ă выходит с 1936 года.) 5.Cotton C. M. Ethnobotany: Principles and application. Chichester-New-York-Brislane-Toronto-Singapore: John Willey and Sons, 1996, 424 p. 6.Martin G.J. Etnobotanica. Manual de metodos. Nordan - Comunidad. Montevideo, Uruguay, 2001

**Заготовка и товарная характеристика некоторых диких съедобных растений в Товузском – Газахском районах**

**В.Н.Аббасова**

В статье представлена информация о товарной характеристике растений, распространенных на территории Товузского и Газахского районов, находящихся в северно-восточной части Малого Кавказа и их массовой заготовки местными общинами. Так как на базарах, расположенных на территории исследования продаются 14 семейств, 24 видов, относящихся к 21 роду диких съедобных растений. По родам: *Rumex* L.-3, *Urtica* L.-2, каждая из остальных 19 родов представляются одним видом. В первую очередь на базарах продаются мокрица, серебрянка. Далее продаются бутень, эремурус (ширяш), кормушка, мята перечная, чина, клюква, крапива и др. Данные продукты продаются в свежем виде. Первичная цена продажи одного килограмма диких съедобных растений составляет 3-2.5 манатов. При изобилии продуктов и при увеличении ассортиментов цена продаж меняется в пределах 1-0.2 манатов. Заготовка и потребительство диких съедобных растений хотя несет стихийный характер, положительно влияет на возмещение потребностей.

Дикие съедобные растения на рынках продаются в различных товарных формах (в свежем, соленом и сушеном виде). Данные продукты в свежем виде продаются в марте – мае месяцах, в соленом и сушеном виде можно сказать, что в течение всего года. Так как соленые и сушеные дикие зеленые овощи без дополнительных расходов хранятся долгое время они стоят на основательной позиции в торговом обороте. 18 видов диких съедобных растений продаются в свежем виде, 4 вида в соленом виде и 8 видов в сушеном виде. С целью товарной характеристики, предотвращения опасности уничтожения и укрепления стойкости в торговом обороте данных растений разработаны конкретные предложения.

***Ключевые слова***: *дикие съедобные растения, товарная характеристика, заготовка уникальных видов*

**Preparation and product characteristics of some wild edible plants in Tovuz - Gazakh district**

**V.N.Abbasova**

The article provides information on the product characteristics of plants distributed in the Tovuz and Gazakh regions located in the north-eastern part of the Lesser Caucasus and their mass harvesting by local communities. Thus, there 24 species belonging to 14 families and 21 species of wild edible plants are being sold in the bazaars located on the territory of the study. By genera: Rumex L.-3, Urtica L.-2, each of the other 19 genera are represented by one species. First of all, wood lice and silverfish were sold in bazaars. Later, buten, eremurus (shiryash), manger, peppermint, rite, cranberry, nettle, etc. were sold. These products are being sold fresh. The initial sale price of one kilogram of wild edible plants is 3-2.5 manat. With abundant products and increasing assortments, the price of sales varies within 1-0.2 manat. Harvesting and consumption of wild edible plants, although of a spontaneous nature, has a positive effect on the recovery of needs. Wild edible plants in the markets are sold in various product forms (fresh, salted and dried). These fresh products are sold in March - May, in salty (marinated) and dried form, it can be said that throughout the year. Thus, salted (marinated) and dried wild green vegetables are stored for a long time at a substantial position in the trade turnover without additional costs. 18 species of wild edible plants are sold fresh, 4 species in salted (marinated) form and 8 species in dried form. For the purpose of product characteristics, the prevention of the danger of destruction and enhancing durability in the trade of these plants developed specific proposals.

***Keywords:*** *wild edible plants, commodity characteristics, unique species harvesting*